AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRLİYİ
BAKI DÖVLƏT UNİVERSİTETİ
TARİX FAKÜLTƏSİ



ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN ANADAN OLMASININ 90-CI İLDÖNÜMÜ MÜNASİBƏTİLƏ MAGİSTRANTLARIN VƏ GƏNC TƏDQİQATÇILARIN RESPUBLİKA ELMİ-PRAKTİK KONFRANSININ

# MATERİALLARI

BAKI – 2013

AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRLİYİ
BAKI DÖVLƏT UNİVERSİTETİ
TARİX FAKÜLTƏSİ

ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN ANADAN OLMASININ 90-CI İLDÖNÜMÜ MÜNASİBƏTİLƏ MAGİSTRANTLARIN VƏ GƏNC TƏDQİQATÇILARIN RESPUBLİKA ELMİ-PRAKTİK KONFRANSININ

# MATERİALLARI

BDU-nun Tarix fakültəsi
Elmi Şurasının qərarı ilə çap
olunur (22 fevral 2013-cü il
tarixli 3 saylı protokol)

BAKI – 2013

Baş redaktor: akademik A.M.MƏHƏRRƏMOV –
Bakı Dövlət Universitetinin rektoru

Redaktor: dos. A.Ə.RZAYEV –
Bakı Dövlət Universitetinin
Tarix fakültəsinin dekanı

**Ümummilli lider Heydər Əliyevin anadan olmasının 90-cı ildönümü münasibətilə Tarix fakültəsi magistrantlarının və gənc tədqiqatçılarının elmi-praktik konfransının materialları.** Baş Hesablama Mərkəzi nəşriyyatı 2013, 458 səh.

**Nəciyev Elnur Rasim oğlu**

# DƏRBƏND IX-XII ƏSR ƏRƏB COĞRAFİYAŞÜNAS-SƏYYAHLARININ ƏSƏRLƏRİNDƏ

Bu dövr ərəb mənbələrinin tədqiqi Azərbaycan tarixşünaslığında Nailə Vəlixanlının adı ilə bağlıdır. Bütövlükdə isə Dərbəndin bu dövrünün tədqiqində ərəb mənbələrinin öyrənilməsində mühüm xidmətləri olan V.F.Minorski, N.A.Karaulov, P.K.Jüze, I.Y.Kraçkovski, Z.M.Bunyadov və başqalarının tədqiqatlarından yararlanmaqla daha müfəssəl məlumatlar əldə etmək olar. Biz əsasən Nailə Vəlixanlının tədqiqatı üzərində dayanacağıq və əsərdən faydalanmaqla ərəb mənbələrindən Dərbəndlə bağlı verilən məlumatlara ümumi bir şəkildə nəzərdən keçirməyə çalışacağıq. Nailə Vəlixanlının 4 fəsildən ibarət əsərində hər fəsildə dövrlər üzrə ərəb səyyahlarının əsərlərinə istinadən bütövlükdə Azərbaycanla bağlı məlumatlar öz əksini tapmışdır. Dərbəndlə bağlı verilən məlumatlar əsasən epizodik xarakter daşıyır və qısa xülasə formasındadır. Biz İbn Xordadbeh, əl-Məsudi, əl-İstəxri, İbn Havqəl, əl-Müqəddəsi, əl-İdrisinin əsərlərindən Dərbəndə dair məlumatlara toxunmaq istərdik.

Əbülqasim Übeydullah ibn Abdullah ibn Xordadbehin əsəri dövrümüzədək gəlib çatan ilk ərəb coğrafiyaşünas-səyyahıdır, «Yollar və məmləkətlər haqqında kitab» əsəri Azərbaycanın, ümumiyyətlə Qafqazın tarixi və tarixi coğrafiyası üçün mühüm mənbələrdəndir. Bu mənbədə Bab əl-Əbvab Qabq dağının uca keçidi olduğunu, Ənuşirəvan tərəfindən tikildiyini və kiçik qalalardan ibarət olduğunu göstərir. Daha sonra bu səddin əl-Qabq dağlarında yerləşdiyini və Xəzər, Əl-Lan ölkəsindən çıxan hər kəsin burdan keçməli olduğunu göstərir. Nailə xanım mənbəni təqdim edəndən sonra şərhlər bölməsində Bab əl-Əbvab termini şərh edir və bu barədə bəhs edən mənbələri xatırlayır.

X əsr ən böyük ərəb tarixçi-coğrafiyaşünaslarından biri Əbu əl-Həsən Əli ibn əl-Huseyn ibni Əli əl-Məsudidir. Məşhur

səyyahın «Qızıl yuyulan yer və cəvahirat mədənləri» əsəri bizim üçün olduqca dəyərlidir. Burada Bab əl-Əbvab və onun ətrafında yaşayan xalqlar haqqında məlumat adlanan hissədə müəllif əvvəlcə Ənuşirəvanın bina etdirdiyi Bab-əl-Əbvab səddi barədə məlumat verir, səddə hər 3 mildən az, yaxud çox məsafədə dəmir darvaza salınması barədə xatırlayır. Daha sonra Şirvanşah məzyədilərin Dərbənddə nəzarəti ələ alması, Xəzər ölkəsi olan Haydaqu tez-tez əl-Babı narahat etməsi barədə maraqlı məlumatlar verilir. Müəllif xəzərlər ölkəsinin yəhudi dinini qəbul etməsi və Bizansdan yəhudilərin xəzərlər ölkəsinə gəlməsi barədə əhəmiyyətli məlumat verir və göstərir ki, xəzərlər ölkəsinin şəhəri-Səməndər əl-Babdan 8 günlük yol qədər aralıdır. Əl-Məsudi qonşu Haydak məmləkəti və əl-Babla Haydak arasındakı ərəb səhralarından qaçıb gəlmiş müsəlman ərəblər barədə maraqlı məlumatlar verir və hətta əl-Bab əhalisinin onlara yardımını xatırladırdı. Əsərin qeyd və şərhlər bölməsində Nailə xanım yazır ki, əl-Məsudinin Kəsra Ənuşirəvan tərəfindən Bab-əl-Əbvab və başqa şəhərlərin əsasınının qoyulması haqqında məlumat bir çox ərəb və fars mənbələrində təkrarlanan səhvdir. Xosrov Ənuşirəvan bir sıra sədlərin tikilməsində mühüm rol oynasa da, Dərbənd şəhərinin deyil, sadəcə bünövrəsi mövcud Dərbənd səddinin başa çatdırılmasında mühüm xidmətləri olan hökmdardır.

Əbu İshaq İbrahim ibn Məhəmməd əl-Farisi, əl-İstəxri X əsr ərəb coğrafi ədəbiyyatı «Yollar və məmləkətlər haqqında kitab» əsərində Dərbəndin liman şəhəri kimi əhəmiyyəti, ticarətdə oynadığı rol, qul alveri, əkinçiliklə bağlı qısa, lakin dolğun məlumatlar verilmişdir. əl-İstəxri yazır ki, «Şəhər Ərdəbildən daha böyükdür. Arranın Bərdə, əl-Bab və Tiflisdən böyük şəhər yoxdur. Arranın sərhədi Bab əl-Əbvabdan Tiflisə, Araz çayı yaxınlığındakı Haciran (Naxçıvan) adlı yerədəkdir. Bundan savayı müəllif Dərbəndə və Dərbənddən müəyyən məntəqələrə olan məsafələri göstərmişdir. Göstərilən məsafələrdə digər ərəb müəlliflərində olduğu kimi fərqliliklər çoxdur.

Ərəb səyyahları içərisində İbn Havqəlin özünəməxsus yeri var. O, Əl-İstəxrinin davamçısı olmuşdur. Onun əsəri tam olmasa da düzəlişlərdən ibarət əl-İstəxrinin əsərinin başqa bir nüsxəsi sayıla bilər. Bu əsər həm də «Yerin surəti kitabı» da adlanır. İbn Havqəl də əl-İstəxri kimi Dərbəndin liman şəhəri kimi əhəmiyyəti, Dərbənddə meyvəçilik, kətan, zəfəran istehsalı barədə maraqlı məlumatlar verən İbn Havqəl Dərbəndi ən böyük şəhərlərdən biri kimi təqdim edirdi. Dərbənddən Tiflisə qırmız ticarətinin geniş yayılmasını göstərən müəllif daha sonra Samur körpüsündən Dərbəndə olan məsafəni (20 fərsəx) verən müəllif Bab əl-Əbvabla xəzərlər ölkəsi arasındakı yerdən başqa [hər yerdə] yaşayış məntəqələrinin bir-birinə qarışdığını göstərirdi və Bab əl-Əbvaba qədər olan yolu eynilə İstəxridəki kimi göstərirdi. Nailə Vəlixanlı mənbəni oxucuya təqdim etdikdən sonra ona şərh verərkən yazırdı: «İbn Havqəl Azərbaycanı, Arran və Ərməniyyənin ümumi xəritəsini çəkmiş və bunu «Azərbaycan xəritəsi» adlandırmışdır. O, həmçinin Xəzər dənizininin xəritəsini tərtib etmiş və Dərbəndədək sahilboyu bütün ərazini Azərbaycan adlandırmışdır. Sonda müəllif «əl-Bab» adı ilə xatırlatdığı adanı Dərbənd şəhəri kimi şərh etmişdir.

X əsr ərəb coğrafiyaşünas-səyyahlarının «son böyük nümayəndəsi» olan əl-Müqəddəsinin «İqlimlərim öyrənilməsi üçün ən yaxşı bölgü» əsərində Dərbənd «xəzərlər tərəfdən divarla möhkəmləndirilmiş yer adlandırır. Əvvəlcə «İqlimlərin öyrənilməsi üçün ən yaxşı bölgü» əsərinin Ər-rihabın dəniz və çayları haqqında bölmədə Bərdənin (Arranın) şəhərləri sırasında Bab əl-Əbvabı xatırlayırdı. Daha sonra Bab əl-Əbvabla bağlı ayrıca məlumat verərək yazırdı: «Xəzərlər tərəfdən divarla möhkəmləndirilmiş hissədə 3 darvaza var: böyük, kiçik və həmişə bağlı olan dəniz yaxınlığındakı darvaza. Dəniz və İslam torpaqları tərəfdən də bir neçə darvazası var. Dağdan dənizin ortasınadək divar çəkilmişdir. Üstündə də bürclər var. Məscidləri qaravulçular qoruyur. Cümə məscid bazar meydanının ortasındadır... Burada su bulağı... su axarları (kanalizasiya) vardır. Əl-Babın Sura və Aqqa adlı 2 divardan və onu birləşdirən və

aralarına qurğuşun tökülən zəncirlənmiş hissədən ibarət olduğunu göstərirdi. Əl-İdrisi də «Ölkələri gəzməkdən yorulmuşun əyləncəsi» adlı əsərinin V iqliminin altıncı hissəsində yazılmışdır: «Bab əl-Əbvab Xəzər sahilində çox böyük şəhərdir. Şəhərin ortasında gəmilər üçün liman vardır. Bu limanının girəcəyinə sədd kimi iki bina tikilmişdir. Buraya girəcəyə zəncir çəkilmişdir və limanın sahibinin icazəsi olmasa heç kəs nə girə, nə də çıxa bilərdi».

Bütövlükdə nəzərdən keçirdiyimiz əsərlər Dərbəndin IX-XII əsrlər tarixinin öyrənilməsi baxımınıdan xüsusi əhəmiyyət kəsb edir. Onları dövrün digər mənbələri ilə müqayisə etməklə daha dolğun məlumatlar əldə etmək mümkündür.

**Nəsirov Nurlan Paşa oğlu**

## XVI ƏSRIN SONU-XVII ƏSRIN ƏVVƏLƏRINDƏ AZƏRBAYCANDA MEMARLIQ

XVI əsrin sonu-XVII əsrin əvvəllərində Azərbaycan memarlıq və şəhərsalma inkişaf edirdi. XVII əsrdə şəhərsalma tədbirləri ölkənin cənub vilayətlərində xüsusi intensivliklə həyata keçirilirdi. XVII əsr bir sıra şəhərlərin böyüməsi bu şəhərlərdə iri mərkəzi komplekslərin yaradılması ilə seçilir. Bu dövrdə şəhərin mərkəzi onun ticarət hissəsinə can atır. Bir sıra hallarda hakimlərin qala və imarətləri öz əhəmiyyətini itirirdi. Bir sıra şəhərlərin baş küçələri məhz XVII əsrdə meydana gəldi. Bu baxımdan Bakı səciyyəvi nümunə ola bilər. Əgər XV əsrdə şəhərin mərkəzi bilavasitə Şirvanşahlar sarayının yanında idisə, XVII əsrdə karvansara və bazarların yerləşdiyi ərazi şəhərin mərkəzinə çevrildi. Əgər Şimali Azərbaycan şəhərlərinin əksəriyyətinin memarlıq baxımından tərəqqisi ölkənin cənub vilayətlərinə istiqamətli idisə, Cənubi Azərbaycan vilayətlərində olan şəhərlərin memarlıq inkişafı Səfəvilər dövləti ərazisinin cənubuna (İran körfəzinə) istiqamətlənmişdi. Bu, dünya ticarət